UOT 334

# AQRAR SAHƏNİN İNKİŞAFINA DÖVLƏT DƏSTƏYİNİN ƏSAS İSTİQAMƏTLƏRİ

**R.R.MUSTAFAYEVA**
**Azərbaycan Dövlət Aqrar Universiteti**

*Məqalədə son illər ərzində aqrar sahəyə dövlət dəstəyinin əsas sahələri araşdırılmışdır və onların gələcək inkişafı üçün əsas istiqamətləri qeyd edilmişdir. Son illər aqrar sektorda ənənəvi sahə olan baramaçılıq, pambığçılıq, tütünçülük, fındıqçılıq və digər valyuta gətirən, sosialyönümlü və ixracyönümlü sahələrin inkişafina diqqət artırılıb. Müəllif bu sahələrdə dövlət tərəfindən görülmüş işləri təhlil etmiş və aqrar istehsal sahəsinin modernləşdirilməsinin əsas istiqamətlərini müəyyən edilmişdir.*

***Açar sözlər**: aqrar sahə, dövlət dəstəyi, kooperasiya, pambığçılıq, baramaçılıq, tütünçülük, fındıqçılıq, inkişaf.*

Son illərdə qeyri-neft sektoruna göstərilən yüksək diqqət nəticəsində iqtisadiyyatın prioritet istiqamətlərindən olan aqrar sahə yeni inkişaf mərhələsinə qədəm qoyub. Bu sahənin inkişafı ölkənin ərzaq təhlükəsizliyinin təmin edilməsində mühüm rol oynayır. Aqrar sahədə aparılan uğurlu islahatlar nəticəsində bir sıra strateji məhsullara olan tələbatın yerli istehsal hesabına tam ödənilməsinə, ölkənin ərzaq təhlükəsizliyində xarici bazardan asılılığın azalmasına, ixracyönümlü məhsulların istehsal həcmini artırmaqla regionların inkişafına nail olunub. Fermerlərin dövlət tərəfindən çoxşaxəli subsidiyalarla təmin edilməsi kənd təsərrüfatı ilə məşğul olanların rifah halının yüksəldilməsinə gətirib çıxarıb.

Kənd təsərrüfatı məhsullarının istehsalı ilə məşğul olan fiziki şəxslərin bu fəaliyyətdən əldə etdikləri mənfəət gəlir vergisindən, həmin fəaliyyət prosesində istifadə olunan əmlakları əmlak vergisindən, kənd təsərrüfatı məhsullarının satışı üzrə dövriyyələr ƏDV-dən 5 il müddətinə azad olunması da sözü gedən sektorun inkişafına müsbət təsir göstərib.

Ilham Əliyevin göstərişinə əsasən “Milli iqtisadiyyat və iqtisadiyyatın əsas sektorları üzrə strateji yol xəritəsinin başlıca istiqamətləri” proqramının 11 istiqamət üzrə strateji yol xəritələri hazırlanmış və Azərbaycan Respublikası Prezidentinin 2016-cı il 6 dekabr tarixli Fərmanı ilə təsdiq edilmişdir. Bu istiqamətlərdən biridə “Azərbaycan Respublikasında kənd təsərrüfatı məhsullarının istehsalına və emalına dair Strateji Yol Xəritəsi” di.

Strateji Yol Xəritəsinin ümumi məqsədi Azərbaycan Respublikasında kənd təsərrüfatı sektorunun yüksək rəqabət qabiliyyətinə və dayanıqlı inkişafına nail olmaqdır. Strateji yol xəritəsində onun əsas məqsədlərindən biri olan əhalinin ərzaq və qida təhlükəsizliyinin təmin olunması çox geniş və əhatəli formada təhlil edilərək görüləcək işlər müəyyən edilmişdir [1]. Bu məqsədlə Ərzaq Təhlükəsizliyi Komissiyasının və Qida Təhlükəsizliyi Agentliyinin yaradılması, beynəlxalq normalara uyğun rasional fizioloji istehlak normalarının hazırlanması, ölkənin, həmçinin hər bir regionun və inzibati rayonun ərzaq məhsulları üzrə tələbatı bu normalar əsasında dəqiqləşdirilərək, ərzaq ehtiyatlarının çeşid və həcm göstəriciləri üzrə yaxın, orta və uzunmüddətli proqnozların hazırlanması nəzərdə tutulur. Onu da qeyd etmək lazımdır ki, artıq bu istiqamətdə konkret işlər görülür. Belə ki, Azərbaycan Respublikası Prezidentinin müvafiq Sərəncamı və Fərmanı ilə 2017-ci illin əvvələrində “Ərzaq məhsullarının tədarükü və təchizatı” Açıq Səhmdar Cəmiyyəti və Azərbaycan Respublikasının Qida Təhlükəsizliyi Agentliyi yaradılmışdır.

2016-ci ilin iyun ayında “Kənd təsərrüfatı kooperasiyası haqqında qanun qəbul edilmişdir və 14 Iyul 2017-ci ildə “Azərbaycan Respublikasında kənd təsərrüfatı kooperasiyanın inkişafına dair 2017-2022-ci illər üçün Dövlət Proqramı” təsdiq edilmişdir. Əsas məqsəd iri kənd təsərrüfatı müəssisələri yaratmaq, məhsuldarlığı artırmaq və rəqabətqabiliyyətli kənd təsərrüfatı məhsulları istehsal etmək. Bu sistem kənd təsərrüfatı məhsulların ixraçatçıları olan bir çox ölkələrdə inkişaf etmişdir və onlarında təcrübəsinin öyrənilməsi mühüm əhəmiyyə kəsb edir. Kooperasiya sisteminin yaradılması innovasiyaların tətbiq edilməsinə də müsbət təsir göstərə bilər. Kooperasiya sistemi məhsul istehsalından başlayaraq onun emalını, saxlanmasını, bazara çıxarılmasını və satışını əhatə edir [2].

Bu istiqamətdə aparılmalı əsas işlərdən biridə kənd təsərrüfatı istehsalçılarını kooperasiyanın mahiyyəti barəsində maarifləndirmək və könüllülük əsasında onları cəlb edərək kooperativlərdə birləşdirməkdir.

Son illər aqrar sektorda ənənəvi sahə olan pambıqçılıq, baramaçılıq, çayçılıq, tütünçülük, fındıqçılıq və digər valyuta gətirən, ixracyönümlü və sosialyönümlü sahələrin inkişafına diqqət artırılıb.

Pambığçılığ Azərbaycanın ənənəvi sahələrindəndir. Bu sahəyə neçə illərdir ki, lazımi diqqət yetirilmirdi, lakin son zamanlar bu sahəyə dövlət dəstəyi artmışdır. Bu sahə sosial yönümlü olduğundan kənd ərazilərində işsizliyin aradan qaldırılmasına da təsir göstərir. 2015-ci il pambıqçılıqda ən uğursuz il olmuşdur, 18 min hektardan cəmi 35 min ton pambıq tədarük edilmişdir. 2016-ci ildən bu sahənin inkişafı üçün çox ciddi tədbirlər görüldü, texnika alındı, dövlət dəstəyi göstərildi, imkan daxilində meliorasiya işləri aparıldı, 51 min hektarda pambıq əkildi və nəticədə 90 min tona yaxın məhsul götürüldü, bu 2015-ci illə müqayisədə üç dəfə çoxdur. Azərbaycan Prezidenti İlham Əliyevin "Azərbaycan Respublikasında pambıqçılığın inkişafına dövlət dəstəyi haqqında" 2016-cı il 22 sentyabr tarixli sərəncamına əsasən istehsalçılara emal müəssisələrinə satdıqları xam pambığın hər 1 (bir) kiloqramına (kondisiya çəkisində) görə 0,1 manat məbləğində subsidiya müəyyənləşdirilmişdir.

Prezident İlham Əliyev "Azərbaycan Respublikasında tütünçülüyün inkişafına dair 2017-2021-ci illər üçün Dövlət Proqramı" nı təsdiq etmişdir. Dövlət başçısının tapşırığına əsasən, tütünçülüyə marağın daha da artırılması məqsədilə stimullaşdırma tədbirləri həyata keçirilməli, fermerlərə güzəştli kreditlərdən və aqrolizinq xidmətlərindən daha geniş istifadə imkanları yaradmaqdır. Proqramın məqsədi ölkədə tütünçülüyün inkişafına dövlət dəstəyini gücləndirmək, bu sahənin potensial imkanlarından səmərəli istifadə etmək, rəqabət qabiliyyətini yüksəltmək və tütün istehsalı ilə məşğul olan əhalinin sosial rifahını daha da yaxşılaşdırmaqdır. Müəyyən edilmişdir ki, emal müəssisələrinə satılmış quru tütünün hər 1 (bir) kiloqramına, yaş tütünün isə hər 10 (on) kiloqramına görə tütün istehsalçılarına 0,05 manat məbləğində subsidiya verilsin [3].

Azərbaycanda tütünçülüyün inkişafı üçün lazım olan bütün şərtlər mövcuddur. Bu sektorda həm böyük ənənə və təcrübə, həm keçmiş strukturdan qalma mütəxəssis bazası, emal fabrikləri, ucuz və yerli xammal əldə etmək və nəhayət, daxili və xarici bazara çıxış imkanlarına malikdir. Tütünçülüyün inkişafına göstərilən diqqət yaxın perspektivdə istehsalı dəfələrlə artırmaq mümkün olacaq. Bu baxımdan, satış bazarını tapmaq, daxili bazarı tam təmin etmək, sonrakı mərhələdə ixrac imkanlarını genişləndirmək qarşıda duran əsas vəzifədir.

Belə ki, 2016-cı ildə tütünün əkin sahəsi 1,4 min hektardan 2,4 min hektara qədər artdı (Cədvəl 1). 2016-cı ilin məhsuluna görə 195 fermerə 95.542,7 manat məbləğində subsidiya, bunların əsas hissəsi 60% - Şəki və 19% - Zaqatala rayonlarının payına düşmüşdür. 2008-ci ildən başlayaraq tütünçülüyün inkişafı ilə bağlı Sahibkarlığa Kömək Milli Fondu tərəfindən 200 nəfərə 2 milyon manat məbləğində güzəştli kredit ayrılıb. Dövlət Statistika Komitəsinin 2017-ci il iyunun 24-nə olan məlumatına əsasən, respublikada 3257 hektar sahədə tütün əkilib. Əkilən tütünün əksər hissəsini (2051 hektar və ya 62,9 faizi) "Virciniya", 5,3 faizini "Berley" sortu təşkil edir. 2016-cı ildə Azərbaycan 2217.9 ton və ya 7982.7 min ABŞ dolları dəyərində tütün xammalının (orta damarcığı çıxarılmayan tütün, orta damarcığı qismən və ya tamamilə çıxarılmış tütünü) ixracını həyata keçirib.

Bu baxımdan, əminliklə demək olar ki, perspektiv və gəlirli sahə olan tütünçülüyün inkişaf etdirilməsi yaxın gələcəkdə həm yeni iş yerlərinin yaradılması, həm ixracın artırılması, həm də ölkəyə valyuta gətirilməsində önəmli rol oynayacaq. Hazırda yeni tütün təsərrüfatlarının salınması, tütünçülüyə dövlət qayğısının getdikcə artması bu sahədə çalışanlara stimul olub. Fermerlərlə bağlanan müqavilələrin sayı da bunu təsdiqləyir. Yerli fermerlər müxtəlif tütün sortları yetişdirirlər. Üstünlük isə, əsasən, yüksək məhsuldarlığa malik "Virciniya" sortuna verilir.

Azərbaycan Respublikasının Prezidenti tərəfindən ölkədə kənd təsərrüfatının ənənəvi sahələrindən olan ipəkçiliyin və fındıqçılığın inkişafının sürətləndirilməsi, bu sahələrin potensial imkanlarından səmərəli istifadə edilməsi və məhsul istehsalına əhalinin marağının artırılması məqsədi ilə 16 noyabr 2016-cı il tarixli 2442 nömrəli Sərəncam imzalanmışdır. Sərəncama əsasən barama toxumlarının, tut (çəkil) tinglərinin və fındıq pöhrələrinin alınması üçün ümumilikdə 1,463 milyon (bir milyon dörd yüz altmış üç min) manat vəsaitin ödənilməsi nəzərdə tutulmuşdur. Həmçinin Sərəncama uyğun olaraq Kənd Təsərrüfatı Nazirliyi tərəfindən tədarük olunan barama toxumlarının, tut (çəkil) tinglərinin və fındıq pöhrələrinin şəhər və rayonların tələbatı nəzərə alınmaqla, məhsul istehsalçılarına əvəzi ödənilmədən paylanılması təmin olunacaqdır.

Fındıq ən çox valyuta gətirən məhsullardan biridir. Bu məhsula çox böyük tələbat var. 2000-ci ildə Azərbaycanda fındıq bağlarının sahəsi 18 min hektar idi, 2013-cü ildə bu, 30 min hektara, 2015-ci ildə 32 min 700 hektara çatıb. Hazırda 55 min hektarda fındıq bağları salınıb. Bu da onun nəticəsidir ki, dövlət bu sahənin də inkişafını öz üzərinə götürüb. Lazım olan bütün texniki tədbirlər dövlət hesabına aparılıb, xaricdən tinglər gətirilib, Azərbaycanda da yetişdirilib və qısa müddət ərzində çox böyük işlər görülübdür. Əkin sahələri 32 min hektardan 55 min hektaradək artıb, yəni 23 min hektarda yeni fındıq bağları salınıb. 14 min 800 ton fındıq ixrac edilib. Fındıq ixrac edilən əsas ölkələr bunlardır: İtaliyaya 40 milyon dollar, Rusiyaya 30 milyon dollar və Almaniyaya 24 milyon dollar səviyyəsində. 2016-ci ildə 10 240 hektar sahədə yeni fındıq bağları salınıb (Cədvəl 1).

Ümumiyyətlə, fındıq istehsalı ölkəmizdə kənd təsərrüfatının inkişafında önəmli rol oynayır. BMT-nin Ərzaq və Kənd Təsərrüfatı Təşkilatının hesablamalarına görə, Azərbaycan fındıq istehsalı üzrə dünyada dördüncü ölkədir. Respublikamızda təqribən 35 min ton fındıq istehsal olunur və onun 90 faizi xarici ölkələrə ixrac edilir. Təsadüfi deyil ki, 2016-cı ildə Azərbaycandan 25 ölkəyə 100 milyon dollardan çox məbləğdə fındıq ixrac olunub. Bu sahədə təbii ki, dövlət dəstəyi ilə keçirilən təşviq tədbirlərinin də böyük rolu var. Bununla yanaşı, məhsulun artırılması məqsədilə dövlət tərəfindən fındıq istehsalçılarına milyonlarla manat güzəştli kreditlər verilib, fındıq pöhrələri alınaraq fermerlərə pulsuz paylanılıb. Bu isə yeni bağların salınmasına, fındıq istehsalının və ixracının daha da artırılmasına geniş imkanlar açıb.

Ümumilikdə ölkə üzrə 12 rayonda – Zaqatala, Qax, Qəbələ, Balakən, Xaçmaz, Qusar, Quba, Oğuz, Şəki, Şabran, İsmayıllı və Yevlax rayonlarında bağların salınması nəzərdə tutulub. Bu məqsədlə 700 min manat vəsait ayrılıb. Vəsait yeni fındıq bağlarının salınması üçün ting yetişdirən fermerlərə subsidiya kimi veriləcək.

Ən böyük fındıqçılıq rayonu olan Qəbələnin 20-yə yaxın kəndində dövlət tədbirləri içində əhali arasında geniş maarifləndirmə işləri aparılmaqla yanaşı, kütləvi şəkildə fındıq tinglərinin əkilməsi işləri həyata keçirilib. Qısa müddətdə rayonda 700 hektar sahədə yeni fındıq bağı salınıb. Mirzəbəyli, Zərgərli, Tikanlı, Nic, Mıxlıqovaq, Solqıca, Bum və digər kəndlərin sakinləri istifadə etdikləri və bələdiyyə mülkiyyətində olan boş torpaq sahələri təmizlənərək əraziyə fındıq tingləri əkiblər. Tinglər kəndlilərin fərdi təsərrüfatlarındakı mövcud fındıq bağlarından çıxarılaraq sakinlərə paylanılır. Bundan əlavə, "Gilan Holdinq" tərəfindən də rayonda böyük fındıq bağlarının salınması üçün tədbirlər görülüb. 2017-ci ilin yaz aylarında rayonda daha 300 hektar sahədə fındıq bağının salınması üçün işlər davam etdirilir. Hər il rayonda 100-120 hektar sahədə yeni fındıq bağı salınırdısa, yeni plana uyğun olaraq, ümumilikdə Qəbələdə, 1000 hektar sahədə yeni bağın salınması qarşıya məqsəd qoyulub.

2016-ci ildə fındıq satışından ölkəyə 105 milyon dollar valyuta gəlib. 2016-ci ildə bir kiloqramının qiyməti 4,8 manat, 2017-ci ilin aprel ayında 6,2 manat olub. Dünya üzrə fındığın qiyməti bizim pulla təxminən 10 manat cıvarındadır. Hazırda fındıqçılıqla 9 min nəfər məşğuldur, yeni bağlar salınandan sonra təqribən 20 min nəfərə çatacaqı gözlənilir. Ixraça kömək məqsədilə Fındıq İstehsalçıları və İxracatçıları Assosiasiyası yaradılıb.

Ölkəmizdə ipəkçiliyin potensial imkanlarından səmərəli istifadə etmək və bu sahənin rəqabət qabiliyyətini artırmaq yönündə ardıcıl tədbirlər görülür. Azərbaycan Prezidentinin 2017-ci il 19 may tarixli "Azərbaycan Respublikasında ipəkçiliyin maddi-texniki bazasının yaxşılaşdırılması ilə bağlı əlavə tədbirlər haqqında" Sərəncamı da bu məqsədə xidmət edir. Bu Sərəncama əsasən Qax Damazlıq İpəkçilik Stansiyasının bərpası, əlavə istehsal sahələrinin yaradılması və müasir avadanlıqlarla təchiz olunması üçün 2017-ci il dövlət büdcəsində nəzərdə tutulmuş Azərbaycan Respublikası Prezidentinin ehtiyat fondundan Kənd Təsərrüfatı Nazirliyinə 4,5 milyon manat ayrılıb. Prezidentin 16 noyabr 2016-cı il tarixli Sərəncamı ilə barama toxumlarının alınmasına 163 min manat, tut tinglərinin alınmasına 600 min manat vəsait ayırıb. Bu vəsait hesabına tədarük olunan barama toxumlarının, tut tinglərinin məhsul istehsalçılarına əvəzi ödənilmədən paylanılıb. Nazirlər Kabinetinin qərarına əsasən isə barama istehsalı ilə məşğul olan şəxslərə barama emalı və ipək istehsalı müəssisələrinin qəbul etdiyi bütün növ yaş baramanın hər kiloqramına görə verilən subsidiyanın məbləği 5 manat müəyyənləşdirilib. Görülən tədbirlər nəticəsində bu sahədə inkişaf başlayıb [5]. Belə ki, 2015-ci ildə Azərbaycanda 200 kiloqram barama tədarük edildiyi halda 2016-cı ildə bu rəqəm 70 tona çatıb.

**Cədvəl**

**Məhsullar üzrə əsas göstəricilərin dinamikası**

| | Göstəricilər | İllər | | | | |
|---|---|---|---|---|---|---|
| | | 2012 | 2013 | 2014 | 2015 | 2016 |
| 1. | Pambıq | | | | | |
| | əkin sahəsi, min. ha | 29,2 | 23,5 | 22,9 | 18,7 | 51,4 |
| | məhsuldarlığ,sen/ha | 19,5 | 19,3 | 17,9 | 18,8 | 17,3 |
| | istehsalı, min. ton | 52 | 45,2 | 41,0 | 35,2 | 89,4 |
| 2. | Tütün | | | | | |
| | əkin sahəsi, min. ha | 1,5 | 1,2 | 1,1 | 1,4 | 2,4 |
| | məhsuldarlığ,sen/ha | 27,9 | 28,4 | 25,8 | 25,4 | 15,2 |
| | istehsalı, min. ton | 4,3 | 3,5 | 2,9 | 3,5 | 3,6 |
| 3. | Fındıq | | | | | |
| | əkin sahəsi, min. ha | 29,7 | 29,8 | 30,5 | 32,7 | 55,3 |
| | məhsuldarlığ,sen/ha | 12,4 | 12,5 | 11,8 | 11,8 | 10,7 |
| | istehsalı, min. ton | 29,6 | 31,2 | 30,0 | 32,6 | 34,3 |

**Mənbə: Azərbaycan Dövlət Statistika Komitəsi 2017.**

Bu il Kənd Təsərrüfatı Nazirliyi tərəfindən Çin Xalq Respublikasından 6000 qutu barama toxumu tədarük edilərək, Qax Damazlıq İpəkçilik Stansiyasında inkubasiyaya qoyulub. Daha sonra isə burada barama qurdları əldə edilərək 31 rayonun kümçülərinə əvəzi ödənilmədən paylanılıb. Yəni Qax Damazlıq İpəkçilik Stansiyası ölkədə ipəkçiliyin inkişafında mühüm rola malikdir və onun bərpası üçün addımların atılması növbəti illərdə barama toxum ilə bağlı xaricdən asılılığı azaldacaqdır.

"Azərbaycan Respublikasında kənd təsərrüfatı məhsullarının istehsalına və emalına dair Strateji Yol Xəritəsi"ndə 2020-ci ildə barama istehsalı, eləcə də emalı üzrə istehsal həcminin ən azı 1000 dəfə artması hədəfinə nail olunmağ planlaşdırılır. Son illər rayonlarda kütləvi şəkildə tut ağacları əkilir. İki

il bundan əvvəl təqribən 300 mindən bir qədər çox tut ağacı var idi. Son 1-2 il ərzində isə onların sayı 2 milyon 200 minə çatdı. Bütün tinglər dövlət tərəfindən xaricdən valyuta ilə alınır, baramaqurdu toxumları da gətirilir və ağacəkmə prosesi kütləvi xarakter alıbdır. Dövlət tərəfindən tapşırıq verilmişdir ki, gələn dörd il ərzində əlavə 8 milyon tut tingi əkilsin.

"Şəki İpək" ASC-nin fəaliyyətinin daha da genişləndirilməlidir. Hazırda "Şəki İpək"in istehsal gücü ildə 135 ton xam ipəkdir. Yaxın gələcəkdə kombinatın istehsal gücünün artırılması və təqribən 3 min ton yaş baramanı emal etmək planlaşdırılır. "Şəki İpək"in fəaliyyəti tam bərpa edilsə 3 min ton yaş barama emal edilə bilər. Azərbaycanın dünya bazarına öz ipəyi ilə daha böyük həcmdə çıxara bilər. Bunun üçün satış bazarlarına çıxışı təmin etmək lazımdır. Nəzərə alaraq ki, bazarlar artıq bölünüb və ixrac bazarlarına çıxmaq üçün gərək əlavə səylər göstərilməlidir.

Kənd Təsərrüfatı Nazirliyinin məlumatlarına əsasən 2017-ci ildə ölkə üzrə 239,8 min barama istehsalçısına subsidiya verilmişdir və bunların əsas hissəsi 11,1% - Zərdab, 10,0% - Füzuli, 7,1% - Şəkinin, 6,9% - Ağcəbədi və 5,4% - Agdam rayonlarının payına düşmüşdür.

Həyata keçirilən islahatların nəticəsidir ki, artıq kənd təsərrüfatının ayrı-ayrı sahələri üzrə müsbət nəticələr əldə edilib. Aqrar sektorun dinamik inkişafı əkin dövriyyəsinin getdikcə artmasında da özünü göstərir. Əkin sahələrinin genişləndirilməsi həm də yeni iş yerləri, kənd əhalisinin əhalinin məşğulluğunun təmin olunması və artan gəlirlər deməkdir.

Aqrar sahənin inkişafı üçün modernləşdiriməsi məsələlərinə son illər geniş yer ayrılır və bu sahədə bir çox işlər tədbirlər həyata keçirilir. Lakin qeyd etmək lazımdır ki, bunlar yalnız başlanğıcdır və bu sahənin inkişafı üçün daha da çox işlərin görülməsi vacibdir.Aqrar istehsal sahəsinin modernləşdirilməsi məsələsində iqtisadi aspektlərə xüsusi fikir verilməli və bunun əsasından aşağıdakı məsələlərə diqqət verilməlidir:

- kənd yerlərində bazar və sosial infrastrukturun formalaşdırılması;
- kənd yerlərində innovasiya və sənayələşdirmə proseslərinin səmərəli dövlət dəstəyi mexanizminin formalaşması;
- kənd təsərrüfatı istehsalçıları və aqrobiznes üçün münbit iqtisadi şəraitin yaradılması;
- aqrar sahənin iqtisadi artımının innovasiya modelinə keçid;
- müasir enerji səmərililik tələblərinə cavab verən keyfiyyətçə yeni texniko- texnoloji bazanın formalaşması;
- aqrar istehsalın elmi, kadr və informasiya təminatı;
- aqrar qanunvericiliyin təkmilləşdirilməsi.

**ƏDƏBİYYAT**

1. Azərbaycan Respublikasında kənd təsərrüfatı məhsullarının istehsalına və emalına dair Strateji Yol Xəritəsi 6 dekabr 2016-ci il. 2. "Azərbaycan Respublikasında kənd təsərrüfatı kooperasiyanın inkişafına dair 2017-2022-ci illər üçün Dövlət Proqramı" 14 iyul 2017. 3. "Azərbaycan Respublikasında tütünçülüyün inkişafına dair 2017-2021-ci illər üçün Dövlət Proqramı" 10 avqust 2017. 4. "Azərbaycan Respublikasında baramaçılığın və ipəkçiliyin inkişafına dair 2018-2015-ci illər üçün Dövlət Proqramı" 27 niyabr 2017-ci il. 5. "Azərbaycan Respublikasında ipəkçiliyin maddi-texniki bazasının yaxşılaşdırılması ilə bağlı əlavə tədbirlər haqqında" Azərbaycan Prezidentinin 2017-ci il 19 may tarixli Sərəncamı

**Основные направления государственной поддержки развития аграрного сектора**

**Р.Р.Мустафаева**

В статье рассмотрены основные аграрные отрасли, которым оказывается государственная поддержка и предложены направления дальнейшего развития. В последние годы усилилось внимание к традиционным отраслям сельского хозяйства страны, в частности шелководству, табаководству и фундуководству. Автор анализирует работу, проделанную при государственной поддержке, и определяет основные направления модернизации аграрного сектора.

***Ключевые слова:*** *аграрный сектор, государственная поддержка, кооперация, хлопководство, шелководство, табаководство, фундуководство, развитие.*

**The main directions of state support for the development of the agricultural sector**

**R.R.Mustafayeva**

The article considers the main agrarian branches, which receive state support and proposes directions for further development. In recent years, attention has been paid to the traditional branches of the country's agriculture, in particular cotton growing, silkworm breeding, tea growing, tobacco growing and hazelnut farming. The author analyzes the work done with state support, and defines the main directions of modernization of the agricultural sector.

***Key words:*** *agrarian sector, state support, cooperation, cotton growing, silkworm breeding, tea growing, tobacco growing, hazelnuts, development.*